**UOT:** 94.(479.24).
**KBT:** 63.3(5 e)64
**MJ №** 152

# İkinci Qarabağ müharibəsi qənimət ədəbiyyatında Heydər Əliyevə münasibət

**Radif Mustafayev***

**Abstrakt.** Məqalədə İkinci Qarabağ müharibəsində qənimət ədəbiyyatında əks edilmiş erməni mənbələrinə istinadən müasir dövr Azərbaycan tarixinə nəzər salınaraq həqiqətlərin aşkarlanması və təbliği ilə əlaqədar fikirlər təqdim edilib.

Bu araşdırmada Ulu Öndər, Ümummilli Lider Heydər Əliyevin həm sovet, həm də müstəqillik dövründəki fəaliyyəti diqqət mərkəzinə alınaraq təhlilə cəlb edilib, müharibə qənimətlərində yer almış başlıca məqamlar işıqlandırılaraq düşmən təbliğatının yanlış və qərəzli qənaətləri ifşa edilib.

**Açar sözlər:** Azərbaycan Respublikası, İkinci Qarabağ müharibəsi, Heydər Əliyev, Dağlıq Qarabağ, milliyyətçilik

## 1.Giriş

Ümummilli lider Heydər Əliyevin layiqli davamçısı, müzəffər Ali Baş Komandan, cənab prezident İlham Əliyevin rəhbərliyi altında 44 günlük Vətən müharibəsində Azərbaycan Respublikasının ərazi bütövlüyü tam təmin edildi. Bu Vətən müharibəsinin iştirakçısı kimi işğalçılardan azad edilmiş Xocavənd rayonunun Böyük Tağlar kəndində qərargah rəisim, mayor Samiq Əliyevin, batareya komandirim kapitan Zaur Gülüyevin, mənim və digər döyüş yoldaşlarımın vasitəsilə əldə etdiyim ədəbiyyat və sənədlər hərbi qənimətlərimiz oldu. Burada yer almış faktların araşdırılması olduqca zəruri olduğundan onlara diqqət etmək bir tədqiqatçı kimi vəzifə borcumuza çevirildi. Belə ki bu qənimət ədəbiyyatında Azərbaycan həqiqətlərinin aşkarlanması və təbliği böyük önəm kəsb etməkdədir.

* Fəlsəfə üzrə fəlsəfə doktoru, dosent,
AMEA Fəlsəfə və Sosiologiya İnstitutu, "İslam fəlsəfəsi" şöbəsinin aparıcı elmi işçisi; Bakı, Azərbaycan
E-mail: hradif@mail.ru
https://orcid.org/0000-0003-0046-1440

**Məqaləyə istinad:** Mustafayev, R. [2023]. İkinci Qarabağ müharibəsi qənimət ədəbiyyatında Heydər Əliyevə münasibət. *"Metafizika" jurnalı. 6*(1), səh.33-43.

***Məqalənin tarixçəsi:***
*Məqalə redaksiyaya daxil olmuşdur: 17.12.2022*
*Təkrar işlənməyə göndərilmişdir: 06.01.2023*
*Çapa qəbul edilmişdir: 06.03.2023*

Buna görə də biz ulu öndər Heydər Əliyevə həsr edilmiş məqaləmizdə elə sözügedən qənimətlərdə əbədiyaşar liderlə bağlı məqamlara diqqət yetirmək, buradakı yanlış, qərəzli, düşmən mövqelərini tutarlı sübut və dəlillərlə ifşa etmək istədik.

**2. Sovet dövründə ulu öndər Heydər Əliyevin fəaliyyətinə münasibət**

Əldə etdiyimiz qənimətlər sırasında ulu öndər Heydər Əliyevin fəaliyyətinə geniş toxunulmuş ədəbiyyat kimi 2015-ci ildə nəşr edilmiş tarix elmləri doktoru, Rusiya Elmlər Akademiyasının N.N.Mikluxo-Maklay adına Etnologiya və Antropologiya İnstitutunun baş elmi işçisi, Rusiya Akademiyasının təbiət elmləri üzrə həqiqi üzvü və etnoqrafik ermənişünaslıq sahəsində dünyada tanınmış mütəxəssis kimi təqdim edilən Alla Ervandovna Ter-Sarkisyansın *"Dağlıq Qarabağ erməniləri (Tarix. Mədəniyyət. Ənənələr)"* adlı iri həcmli (918 səhifə+40 s. rəngli illüstrasiyalar, xəritələr) kitabı səciyyəvidir. Belə ki, bütün səyləri ilə Qarabağın, o cümlədən də Dağlıq Qarabağ Muxtar Vilayətinin Azərbaycan SSR-nin (Azərbaycan Respublikasının) tərkibində olduğunu inkar edib, bunu böyük ədalətsizlik hesab etmiş müəllif, Sovet dövründən bəhs edərkən başqa şəxslərlə yanaşı o zamanlar Azərbaycan SSR DTK-nın rəhbəri olmuş ümummilli lider Heydər Əliyev barəsində çoxlu qeydlər etmişdir. A.Ter-Sarkisyans yazır ki, hələ 1969-cu ilin aprelində Heydər Əliyev SovİKP MK-nın nəzdindəki Partiya Nəzarəti Komitəsinə Dağlıq Qarabağla əlaqədar qeydlərini ünvanlamışdır. Belə ki, ümummilli lider Heydər Əliyevin qeydində deyilir ki, *"Dağlıq Qarabağ Muxtar Vilayətində milliyyətçi səciyyə daşıyan təzahürlər baş verir. Son illərdə bu vilayətdə yaşayan milliyyətçi elementlər, eləcə də Ermənistan SSR-nin bəzi sakinləri əhali arasında vilayətin Azərbaycanın tərkibindən çıxaraq Ermənistana birləşdirilməsi cəhdlərini alovlandırmağa səy göstərməkdədirlər. Bəzi gənclər, o cümlədən də komsomolçular bu milliyyətçi ünsürlərin təsiri altına düşür... DQMV-də gənclərin milliyyətçi hərəkətləri 1968-ci ildə də baş vermişdir"* [Тер-Саркисянц, А. Е., s.338-339]. Həmişə Sovet İttifaqının yuxarı rəhbərliyinə müraciət edildiyini müxtəlif faktlarla göstərmiş müəllif hətta o vaxtlar SovİKP MK-nın katibi M.Suslov və digər nüfuzlu şəxslər tərəfindən bu cəhdlərin qarşısı alındığı təqdirdə, bütövlükdə Azərbaycan və xüsusilə də ulu öndər Heydər Əliyev tərəfindən Dağlıq Qarabağdakı ermənilərin oxşar müraciətlərinin "milliyyətçi ünsürlər"in səyləritək qiymətləndirilməsini vurğulamışdır. Hətta o, 1977-ci ildə SSRİ-nin yeni konstitutsiyasının müzakirələri zamanı da ölkənin rəhbər orqanlarına Qarabağ problemi ilə əlaqədar çoxsaylı məktublar göndərildiyini yazır. Guya ən yüksək səviyyədə belə bu problemin olduğunu qəbul etsələr də həllinin qeyri-müəyyən vaxta təxirə salındığını yazmış müəllif bu baxımdan SSRİ NŞ Prezidiumunun 23 noyabr 1977-ci il iclasının protokolunu misal gətirir.

Burada deyilir ki, *“Bəzi tarixi şərtlər nəticəsində bir neçə onilliklər əvvəl Dağlıq Qarabağ süni şəkildə Azərbaycana birləşdirilmişdir. Bu zaman vilayətin tarixi keçmişi, onun milli tərkibi, xalqın istəyi və iqtisadi maraqları nəzərə alınmamışdır. Onilliklər keçsə də Qarabağ məsələsi qalır və əsrlər boyu dostluqla bağlı olan iki xalq arasında narahatçılıq və arzuolunmaz məqamlar doğurmaqdadır. Dağlıq Qarabağı (ermənicə “Arsax”) Ermənistan SSR-ə birləşdirmək lazımdır. Onda hər şey qanuni yerini tutacaqdır”. Amma buna baxmayaraq müəllif təəssüf hissi ilə qeyd edir ki, “Halbuki, SovİKP MK-nın Siyasi Bürosu bu təklifi kənara qoymuşdur. Dövriyyədə “mürəkkəb”, “çətin”, “vaxtı deyil”, “belə problemlər çoxdur” kimi fikirlər yer almışdır”* [Тер-Саркисянц, А. Е., s.339].

A.Ter-Sarkisyans kitabın bir çox yerlərində Dağlıq Qarabağ Muxtar Vilayətində guya acınacaqlı şərait ucbatından əhalinin, xüsusən də gənclərin buradan köçüb getdiklərini vurğulayır [Əlizadə, A, s.3]. Halbuki, özü də etiraf edir ki, o dövrlərdə baş vermiş şəhərləşmə prosesi kəndlərə və əhali arasında qocaların sayının artmasına təsir etməyə bilməzdi. Amma bütün bunların Azərbaycan hakimiyyəti tərəfindən qərəzli şəkildə həyata keçirildiyini iddia edən müəllifə görə *“Halbuki Azərbaycan rəhbərliyinin fikrincə, [DQMV-ə] iqtisadi təzyiq faktorları vilayətin milli (əslində etnik olmalıdır-R.M.) tərkibini daha tez dəyişdirməni həyata keçirməyə kifayət etmirdi”* [Тер-Саркисянц, А. Е., s.341]. Guya Dağlıq Qarabağda azərbaycanlı əhalinin (burada etnik baxımdan qeyri-hay, etnik erməni olmayan əhali nəzərdə tutulur- R.M.) 1970-ci illərə qədər baş vermiş kortəbii mexaniki artımı da hakimiyyət tərəfindən uzun və qeyri-effektiv hesab edilərək *“Qarabağ ermənilərinin mənəvi və mədəni həyat sahələrində sıxışdırılmalarını artırmaq qərarı alınmışdı”* [Тер-Саркисянц, А. Е., s.341]. Bu əsassız müddəasına “sübut” kimi baş vermişləri təsvir edərkən müəllif yazır ki, *“1975-ci ilin martında muxtar vilayətin yaranma tarixinin və sosial-iqtisadi inkişaf proseslərinin yanlış şəkildə işıqlandırılmış Sov.İKP Ümumi Şurasının plenumu çağırılmışdır”* [Тер-Саркисянц, А. Е., s.341]. Hər baş vermişdə erməniliyə, xüsusən də Qarabağ ermənilərinə qarşı ədalətsizlik olduğunu aşılamağa çalışan müəllif yazır ki, sözügedən *“Plenumda vətənpərvərlik tərbiyəsi məsələlərinə baxılıb milliyyətçiliyə qarşı mübarizədən bəhs edilərək bununla da ermənilərin narazılıqları və onların milli hərəkatı, erməni milliyyətçiliyi nəzərdə tutulurdu”* [Тер-Саркисянц, А. Е., s.341-342]. Hətta plenumun qəbul etdiyi qərarda vilayətin məsul vəzifələrinə fəal şəkildə “bütün milliyyətlərin nümayəndələri”ndən seçilmələrini A.Ter-Sarkisyans təhrif edərək bildirir ki, *“bu əslində o demək idi ki, söhbət azərbaycanlılardan/azərbaycanlıların məsul vəzifələrə təyin edilməsindən gedirdi”* [Тер-Саркисянц, А. Е., s.342]. Belə ki, müəllifə görə

"Bu plenumdan sonra Dağlıq Qarabağ ermənilərinin mənəvi və mədəni həyatlarına Azərbaycanın hakim orqanlarının /dairələrinin müdaxilələri kəskin şəkildə artdı" [Тер-Саркисянц, А. Е., s.342]. Bəlkə də A.Ter-Sarkisyansı qəzəbləndirən başlıca fakt özünün qeyd etdiyi kimi, hər yerdə "DQMV-i haqqında yazarkən vilayətin yerli əhalisi (o burada Qarabağdakı haylaşdırılmış albanları, Qarabağ ermənilərini nəzərdə tutur-R.M.) azərbaycanlı adlandırılmağa başlandı" [Тер-Саркисянц, А. Е., s.342]. Sanki Sovet İttifaqının dağıldığı təəssüratını oyadan müəllifdən oxuyuruq ki, "Tamamilə [DQMV-nin] Ermənistanla bütün mədəni əlaqələri, hətta radioverilişlərinin qəbulu da kəsildi" [Тер-Саркисянц, А. Е., s.342]. Beləliklə də DQMV-də milli tərkibin və kadr siyasətinin kəskin şəkildə dəyişdiyini bildirən müəllif əlavə edir ki, "Qarabağ erməniləri Yerevandan radioverilişlərə qulaq asmaq qadağasından başqa Yeravan televiziya verilişlərinə, əksər yerlərdə isə Moskvadan yayınlananlara baxmaq imkanından məhrum olmuşdular" [Тер-Саркисянц, А. Е., s.343]. Görünür yalanlarını bir qədər inandırıcı etmək üçün A.Ter-Sarkisyans davam edir ki,

> *"...Mərkəzi teleyayım proqramlarının birtəhər baxıla bilindiyi yerlərdə görüntünün keyfiyyəti olduqca aşağı idi"* [Тер-Саркисянц, А. Е., s.343].

Bəlkə də nifrətinin ifadəsini gizlədə bilməyən müəllif gileylənir ki, *"Əslində yalnız Bakıdan yayımlanan bir proqram və son illərdə İrandan (o da səssiz) yayımlananlar işləyirdi"* [Тер-Саркисянц, А. Е., s.343]. Halbuki, həqiqəti dana bilməyən (amma bacardığı qədər qərəzli vermiş) müəllifdən oxuyuruq ki, *"Bakıdan yayınlanan verilişlərin əksər hissəsi Azərbaycan dilində getsə də yalnız həftədə iki dəfə iş vaxtı yarım saat Bakı televiziyası respublikada yaşayan ermənilər üçün erməni dilində proqram yayımlasa da, bunlar Azərbaycanda baş vermiş xəbərlərə həsr edildiyindən təbii ki, erməniləri təmin edə bilməzdi"* [Тер-Саркисянц, А. Е., s.343].

80-ci illərdə DQMV-dəki təhsil vəziyyətindən də şikayətlənən A.Ter-Sarkisyans bəlkə də ürək ağrısı ilə vurğulayır ki, "O vaxtlardan Azərbaycan dilinin də öyrənilməsi məktəb proqramlarına məcburi fənn kimi daxil edildi" [Тер-Саркисянц, А. Е., s.343]. Həqiqətən də, yuxarıda qeyd etdiyimiz qənimətlər arasında məsələn, o zamanlar Hadrut rayonunun Böyük Tağlar kənd sakini Mosiyan Bəylər Apsenoniçə 1978-ci ilin 7 iyul tarixində verilmiş səkkizillik təhsil haqqında şəhadətnamədə və həmkəndlisi Çakmazyan Zaven Hambarsumoviçə aid Azərbaycan SSR Təhsil Nazirliyinin 1981-ci ilin 10 iyul tarixində verilmiş Orta təhsil haqqında Attestatda "Azərbaycan dili" sətrinin önündə azərbaycanca və rusca müvafiq olaraq "keçirilməyib", "не изуч." və "öyrənilməyib", "не обучался" yazılmışdır. Görünür belə bir durum A.Ter-Sarkisyansa daha xoş olduğundan o təəssüf hissi ilə yazır ki, *"Əgər Qarabağ ermənilərinin ana dili kimi erməni dilini (xüsusən də,*

*əksəriyyəti üçün bu Qarabağ dialekti idi) hesab etdiklərini nəzərə alsaq onda uşaqların tədrisində əldə rəhbər tutulan Bakıdan göndərilmiş məktəb təhsil sisteminin hansı əlavə çətinliklər törətdiyi aydın olurdu”* [Тер-Саркисянц, A.E., s.343]. Əslində 1980-ci illərdə Azərbaycan dövlətinin Mərkəzi Komitənin Birinci Katibi Heydər Əliyevin başçılığı ilə vətəndaşlarına sahib çıxdığı addımlardan narahat olmuş müəllif yazır ki, “Müəllimlər həmçinin son illərdə Yerevandan göndərilmiş tədris proqramları əvəzinə onların əksəriyyəti üçün anlaşılmaz dildə olan Bakıdan göndərilmiş proqramların onlara yollanmasından narazı idilər” [Тер-Саркисянц, A.E., s.343-344]. Yenə də müəllif vurğulayır ki, *“Bu faktlar erməni mühitində, xüsusən də məlum olduğu kimi, istənilən sosial təhriflərə daha çox həssas olan gənclər arasında güclü emossional əks-səda doğururdu”* [Тер-Саркисянц, A.E., s.344].

A.Ter-Sarkisyans hələ 1960-cı illərdə meydana çıxmış Azərbaycan tarixçiləri və arxitektorlarının da erməni xalqına dostcasına deyil, daha çox düşmənçilik mövqeyindən yanaşdıqlarını iddia edərək onların guya erməni xristian mədəniyyəti abidələrini “əvvəlcə alban, daha sonra isə Azərbaycan mənbələri elan edib, xalqlarını qədim xristian albanları və onların mədəniyyətlərinin varisləri olduqlarını bildir”mələrinə qarşı etiraz edir [Тер-Саркисянц, A.E., s.346, 347, 348, 349, 350, 351, 352, 353]. [Fikirlərini əsaslandırmaq üçün A.Ter-Sarkisyansın istinad etdiyi V.A.Şnirelmanın yazdıqlarına münasibətdə yenə də AMEA Fəlsəfə və Sosiologiya İnstitutunun görkəmli simalarından biri kimi mərhum f.ü.e.d., prof. Zümrüd Quluzadənin “Концептуальные проблемы исследования социокультурного развития (конец XX-начало XXI вв.) Ч.I. Баку: «Текнур», 2009, 396 с.-dakı tutarlı cavablarına baxmaq olar]. Uzaq keçmişlə yanaşı, 1948-1953-cü illərdə Ermənistan Respublikasından azərbaycanlıların deportasiya edildiyini də təhrif edən müəllif, əksinə ermənilərin Azərbaycandan köçdüklərinin əsasən məcburiyyətdən doğduğunu iddia edərək guya 1976, 1980, 1985-ci illrdə aparılmış etnososioloji sorğuların nəticəsində “Azərbaycandan miqrasiyaların motivləri arasında daha çox sosial-iqtisadi və mədəni diskriminasiyanın hiss edildiyinin vurğulandığı”nı aşkarlayır [Тер-Саркисянц, A. E., s.355]. Hətta A.Ter-Sarkisyansın “...1979-cu il siyahıya alınmasına görə irandilli talışlar (1926-cı ildə onlar 77,3 min nəfər idi), kürdlər (41,2 min), dağ yəhudiləri (10,3 min), farslar (?) (9,4 min) tamamilə yox olmuş; digər xalqların nümayəndələri qismən assimilyasiyaya uğramış, xüsusən də tatlar (“görkəmli etnoqraf”ın tatları irandilli, daha doğrusu Hind-Avropa dillərinin Ari qolu, Hind-İran alt qolu, İran qrupu, Cənub-qərb alt qrupu hesab etməsi maraq doğurur-R.M). (onların sayı 1926-cı ildə 22,4 mindən 1979-cu ildə 8,7 minə qədər azalmışdı), saxurlar (müvafiq olaraq 15,6 mindən 8,5 minə qədər) [azalmışdır]” gülüş doğurmaya bilməz [Тер-Саркисянц,A.E., s.355]. Bir

sözlə Dağlıq Qarabağın Azərbaycan Respublikası tərkibində muxtar vilayət kimi qalmasını tarixi ədalətsizlik hesab edən müəllifə görə buradakı etnodemoqrafik inkişafdakı qeyri-təbiiliyə səbəb guya *"ilk növbədə Azərbaycan hakimiyyətinin həyata keçirdiyi ayrı-seçkilik siyasəti ilə şərtlənən ermənilərin regiondan köçmə səviyyələrinin yüksək olması və eyni zamanda da, xüsusilə də 1960-cı illərdən başlayaraq azərbaycanlıların bu regiona məqsədyönlü şəkildə axın etmələri ilə əlaqədar olmuşdur"* [Тер-Саркисянц,А.Е., s.356]. Bu sayaq iddialarını davam etdirən A.Ter-Sarkisyans yazır ki, *"Nəticədə DQMV-nin Qarabağ ermənilərinin sosial-iqtisadi, mədəni və demoqrafik inkişafı Ermənistan SSR-nin həmin parametrləri ilə müqayisədə olduqca geri qalırdı"* [Тер-Саркисянц,А.Е., s.357]. Guya "Qarabağ ermənilərinə münasibətdə bütün bu qeyd edilmişlər son nəticədə Dağlıq Qarabağ ermənilərinin onlara qarşı edilmiş tarixi ədalətsizliyi aradan qaldırmaq üçün 1980-ci illərin ikinci yarısındakı milli-azadlıq hərəkatının hissediləcək şəkildə fəallaşmasına gətirib çıxarmışdır" [Тер-Саркисянц,А.Е., s.358].

1980-ci illərin ortalarında SSRİ-də M.S.Qorbaçovun həyata keçirdiyi "Yenidənqurma" siyasətinin erməni cəmiyyəti tərəfindən dəstəkləndiyini bildirən A.Ter-Sarkisyans, Sovet rəhbərliyinin elan etdiyinin əksinə olaraq milli məsələnin heç də həll edilmədiyini xatırladır. Bir sıra milli ziddiyyətlər fonunda müəllif bildirir ki, "Sovet İttifaqındakı ilk və uzun sürən millətlərarası münaqişələrdən biri də Azərbaycanın başçılığı ilə həyata keçirilən Dağlıq Qarabağ ermənilərinin münaqişəsi oldu" [Тер-Саркисянц, A.E., s.359]. Halbuki, A.Ter-Sarkisyans özü etiraf edir ki, hələ *"...1987-ci ilin ikinci yarısında DQMV-nin Ermənistan SSR-yə birləşdirilməsi üçün imza toplanılması kompaniyasına çevrilən özünəməxsus referendium keçirilmişdir"* [Тер-Саркисянц,А.Е., s.379]. Və yaxud da ulu öndər Heydər Əliyevin 1993-cü ilin 15 iyununda hakimiyyətə qayıtması ilə əlaqədar hadisəyə qeyd yerində müəllif yazır ki, "1980-ci illərin sonlarında, artıq Heydər Əliyev [Sovet rəhbərliyində] iş başında olmadığı vaxtlarda M.S.Qorbaçov ətrafındakılarla Azərbaycanın keçmiş başçısına (Heydər Əliyevə-R.M.) qarşı "Rəşidov işindən də təmiz iş aparıldığını" bölüşürdü" [Тер-Саркисянц, A.E., s.466]. Hətta Rusiyanın keçmiş prezidenti B.N.Yeltsinin xatirələrinə istinad etmiş A.Ter-Sarkisyans bir daha ümummilli lider Heydər Əliyevə qarşı aparılmış çirkin kompaniyanı ifşa etmiş olur.

**3.Ümummilli lider Heydər Əliyevin müstəqillik dönəmindəki fəaliyyətinə münasibət**

Məlum olduğu kimi, artıq dövlət müstəqilliyini elan etmiş Azərbaycan Respublikasında ikinci dəfə hakimiyyətə qayıtmış ulu öndər Heydər Əliyev bütün manelərin öhdəsindən uğurla gələ bildi. Bunlardan birinin etirafı kimi,

müəllifdən Heydər Əliyevin, məsələn, 1993-cü ilin 20 iyulunda Rusiya emissarı V.N.Kazimirovla görüşərkən özünün və dövlətimizin qətiyyətini necə nümayiş etdirdiyini oxuya bilərik. Belə ki, V.N.Kazimirovun "Qarabağa sülh" kitabında bu görüş haqqında parçadan müəllif yazır ki, o (V.N.Kazimirov-R.M.) Heydər Əliyevlə aparılmış danışıqları "kifayət qədər çətin, əvvəlcə sətiraltı mübahisəli, daha sonra isə birbaşa inadkar, gərgin [şəkildə keçirildiyini]" vurğulamışdır [Тер-Саркисянц, А. Е., s.466].

Bütövlükdə ümummilli lider Heydər Əliyevin hakimiyyətinin əvvəlki iqtidarlardan fərqli olduğunu vurğulayan müəllif, dərhal 23 iyul 1993-cü ildə Ağdam şəhər mərkəzinin işğal edilməsi ilə guya Heydər Əliyevin nüfuzuna hissediləcək dərəcədə zərbə vurulduğunu iddia edir [Тер-Саркисянц, А. Е., s.474]. Halbuki, özü də etiraf etməli olur ki, bu hadisə ilə əlaqədar BMT-nin Təhlükəsizlik Şurasının 29 iyul tarixli 853 saylı qətnaməsi qəbul edilmişdir. 822 saylı qətnaməni isə o, Dağlıq Qarabağın tərəf kimi tanınmasına görə ermənilər tərəfindən qəbul edildiyini vurğulayır [Тер-Саркисянц, А. Е., s.475].

Daha sonra Füzuli, Cəbrayıl, Qubadlı və Zəngilan rayonlarının işğallarına görə 14 oktyabr 1993-cü ildə 874 saylı qətnamənin, 12 noyabrda isə 884 saylı qətnamənin qəbul edilərək Minsk Qrupunun qrafikinə əsasən erməni silahlı qüvvələrinin Azərbaycan ərazilərindən çıxarılmasının tələb edildiyini də etiraf etməli olur [Тер-Саркисянц, А. Е., s.475].

Erməni müəllif adını çəkməsə də, məhz ümummilli lider Heydər Əliyev sayəsində, Azərbaycanın yeni vasitə və qüvvələr əldə edib, 1993-cü ilin dekabrında əks hücuma keçməklə yanaşı, İslam dünyası və Qərblə əlaqələrinin genişlənməyə başladığını qeyd edir [Тер-Саркисянц, А. Е., s.476]. A.Ter-Sarkisyans o zaman erməni separatçılarının başında durmuş R.Köçəryanın Rusiyanın vasitəçiliyi ilə 16 dekabrda atəşkəs əldə etmək istədiyini xatırladır [Тер-Саркисянц, А. Е., s.476]. Bütün bunları qəbul etməyən Azərbaycan tərəfini isə o, özünün əks-hücuma keçməsi ilə xatırlayır. Xüsusilə də Qərb şirkətləri ilə Xəzərin neft yataqları ilə əlaqədar yenə də adını qeyd etməsə də, ümummilli liderin aktiv danışıqlar apardığını vurğulayır.

Müəllif, guya, 1994-cü ilin fevralında cəbhədəki vəziyyətin Azərbaycanın xeyrinə olmadığını bildirərək Azərbaycan Respublikasının prezidenti Heydər Əliyevin 8-12 fevral tarixlərində Türkiyə Respublikasına səfər edib orada dövlət və hökümət rəhbərləri ilə görüşdüyünü qeyd edir. Ümummilli lider Heydər Əliyevin Türkiyə rəhbərliyi ilə müxtəlif məsələlər üzrə 16 razılığa gəlindiyini bildirən müəllif, bundan sonra hər iki tərəfin Rusiya Müdafiə Naziri P.S.Qraçova müraciət etdiklərini bildirir. [Тер-Саркисянц, А. Е., s.477].

A.Ter-Sarkisyans artıq fevralın sonunda ümummilli lider Heydər Əliyevin Londonda “Dostluq və əməkdaşlıq” haqqında səkkiz müqavilə bağladığını və bunların olduqca uğurlu olduğunu qeyd və etiraf edir. [Тер-Саркисянц, А. Е., s.477].

Müəllif Bişkek görüşü öncəsi 3-4 may tarixində Azərbaycan Respublikasının prezidenti Heydər Əliyevin Brüsselə səfər etdiyini və Azərbaycanın NATO-nun “Sülh naminə əməkdaşlıq” proqramına qoşulması üçün razılıq verdiyini və bununla da Rusiya ilə MDB-nin sülhməramlı səylərini zəiflətdiyini bildirir [Тер-Саркисянц, А. Е., s.479]. Halbuki, özü də qeyd etdiyi kimi, 4-5 may 1994-cü ildə “Bişkek Protokolu” qəbul edilmişdir.

Bir daha erməni işğalının təsdiqi kimi, müəllifdən oxuyuruq ki, o “Qarabağ ordusu” adı altında Gəncə şəhərini də işğal etmək niyyətində olduqlarını etiraf edir [Тер-Саркисянц, А. Е., s.482].

Müəllif 12 may 1994-cü ildə “Atəşkəs haqqında razılaşma”nın imzalandığını qeyd edir. O, vurğulayır ki, o zaman Heydər Əliyev münaqişə ərazisinə rusiyalı sülhməramlı qüvvələrin yerləşdirilməsinə etiraz etmişdir [Тер-Саркисянц, А. Е., s.483].

A.Ter-Sarkisyans 20 sentyabr 1994-cü ildə, yenə də adını çəkmədiyi ümummilli lider Heydər Əliyev tərəfindən, “Əsrin müqaviləsi”nin imzalandığını qeyd edir.

O, 1996-cı ildə Minsk Qrupunun Rusiya və Finlandiyanın həmsədirliyi ilə danışıqların 8-ci raundunun baş verdiyini qeyd edərək, artıq burada Azərbaycan tərəfi (sözsüz ümummilli lider Heydər Əliyev başda olmaqla) ərazi bütövlüyü məsələsini, işğal olunmuş torpaqların boşaldılması, o cümlədən də Şuşa və Laçının azad edilməsi məsələlərində israr etmişlər [Тер-Саркисянц, А. Е., s.488]. Müəllif qeyd edir ki, həmçinin Dağlıq Qarabağın demilitarizasiyası təqdirində geniş muxtariyyət və əhalisinin təhlükəsizliyinə söz verilmişdir.

Müəllif etiraf edir ki, 24 noyabr 1996-cı il Dağlıq Qarabağda keçirilmiş prezident seçkiləri “Aparıcı Qərb ölkələri və Rusiya tərəfindən “qeyri-qanuni” hesab edilmişdir” [Тер-Саркисянц, А. Е., s.489].

Yenə də müəllifdən, ümummilli lider Heydər Əliyevin adı xatırlanmadan, oxuyuruq ki, 1996-cı ildə Lissabondakı ATƏT-in sesiyasında yekun razılıq Azərbaycanın ərazi bütövlüyü dəstəklənməklə erməni nümayəndə heyətinin narazılığına səbəb olmuşdur [Тер-Саркисянц, А. Е., s.490]. Çünki, erməni tərəfinin “xalqların öz müqəddaratını müəyyən etmək” prinsipi qəbul edilməmişdi. A.Ter-Sarkisyans 11 fevral 1997-ci ildə Finlandiyanın xarici işlər naziri, cənab T.Halonendən sitat gətirir ki, “Lissabon sammitindəki dramatik çevriliş danışıqlar prosesinə öz damğasını qoydu... Rollar dəyişdi; vasitəçilərin mövqeləri ilə razılaşan Azərbaycan

tərəfi tamamilə Ermənistanın fəaliyyət azadlığının olmadığını ortaya çıxardı...Azərbaycan beynəlxalq ictimaiyyətin gözü önündə Ermənistanı küncə sıxışdırdı. Hətta həllin olmaması belə Azərbaycanın qələbəsi oldu. Ermənistan qınına girən ilbiz kimi ortalığa çıxan vəziyyəti müzakirə etmədən özünə çəkildi” [Тер-Саркисянц, А. Е., s.491].

Bir sözlə, fikrimizcə bu və digər məqamlarda görünən ümummilli lider Heydər Əliyevin prinsipiallığını və Azərbaycanın haqlı mövqelərinin necə qoruduğu barədə bəhs edərək A.Ter-Sarkisyansın adıçəkilmiş kitabında nə qədər də təhrif edilmiş, saxta məqamlar yer alsa da, ölkəmizin bu olduqca mürəkkəb, çətin və eyni zamanda da milli maraqlarımızın heç zaman güzəşt edilmədiyi ulu öndər və Müzəffər Ali baş komandan İlham Əliyevin hakimiyyət illərində baş vermişlərin bu prizmadan da araşdırılması olduqca vacibdir.

**4.Nəticə**

II Qarabağ-Vətən müharibəsində qənimət kimi əldə etdiyimiz 2015-ci ildə nəşr edilmiş Alla Ervandovna Ter-Sarkisyansın “Dağlıq Qarabağ erməniləri (Tarix. Mədəniyyət. Ənənələr)” adlı iri həcmli kitabında XX əsr tariximiz və xüsusən də ümummilli lider Heydər Əliyev haqqında baxışları aşağıdakı şəkildə ümumiləşdirə bilərik:

- XX əsr Sovetlər dönəmində Azərbaycan SSR-i Dağlıq Qarabağ Muxtar Vilayətində baş vermiş milliyyətçi, separatist cəhdlər guya Qarabağ ermənilərinin milli-azadlıq hərəkatı olmuşdur. Halbuki, bütün bunların əsl qiymətini, müəllifin qeyd etdiyi kimi, hələ 60-cı illərdə ulu öndər Heydər Əliyev olduqca dəqiq müəyyən etmişdir.
- Guya Sovet rəhbərliyinin laqeydliyi, Azərbaycanın məqsədyönlü siyasəti nəticəsində Qarabağ ermənilərinə qarşı ədalətsizlik edilərək onlar həmişə etno-mədəni, sosial, iqtisadi diskriminasiyaya məruz qalmışlar. Lakin istənilən bir əsaslı tədqiqat bütün bunların yanlış və qərəzli olduğunu deməyə əsas verir.
- 80-ci illərin sonu 90-cı illərin əvvəllərində baş vermiş hadisələrdə Qarabağ ermənilərinin milliyyətçi, separatist, ekstremist fəaliyyəti deyil, guya DQMV-nin Azərbaycandan ayrılaraq qondarma Arsax respublikasının müstəqilliyi istiqamətində addımlar atılmışdır.
- Müəllifin də qeyd etdiyi kimi, məhz ümummilli lider Heydər Əliyevin ikinci dəfə hakimiyyətə qayıtdıqdan sonra Ermənistan, Azərbaycan və Dağlıq Qarabağ münaqişəsinin həllində köklü dəyişikliklər baş verib, Azərbaycanın haqlı mövqeləri daha da prinsipial şəkildə qorunmuşdur.

## ƏDƏBİYYAT

**1.** Тер-Саркисянц, А. Е. (2015). *Армяне Нагорного Карабаха: История. Культура. Традиции.* Институт политических и социальных исследований Черноморско-Каспийского региона. -М.: НП ИД «Русская панорама», 918 с.+40 с.цв.ил., карты

**2.** Əlizadə, A. (2021). "Cənubi Qafqazda "Qaz qarşıdurmaları" (1962-1967). *Həyat sosiologiyası (tarix və müasirlik prizmasından)" toplusu*, s.63-73.

**3.** Кулизаде, З. (2009). *Концептуальные проблемы исследования социокультурного развития (конец XX-начало XXI вв.)* (Ч.I). Баку: «Текнур», 396 с.

**4.** Mustafayev, R. (2021). II Qarabağ-Vətən müharibəsi qənimətlərində Azərbaycan həqiqətlərinə baxış. *Cənubi Qafqazda ərazi-sərhəd problemləri: Qars müqaviləsindən Şuşa bəyannaməsinə*, 23 sentyabr, Bakı, Respublika Elmi Konfransı, tezislər, s.55-56.

## Отношение к Гейдару Алиеву в трофейной литературе Второй Карабахской Войны

**Радиф Мустафаев***

**Абстракт.** В статье ссылаясь на трофейную литературу Второй Карабахской Войны, в которой отражены древнеармянские источники рассмотрена современная история Азербайджана и представлены заключения в связи раскрытием и пропагандой истинных выводов.

В данном исследовании уделено внимание деятельности Великого Предводителя, Общенационального Лидера Гейдара Алиева как в советский, так и в период независимости, а также освещены основные моменты, отраженные в военных трофеях, разоблачены ошибочные и предвзятые выводы вражеской пропаганды.

**Ключевые слова:** Азербайджанская республика, Вторая Карабахская Война, Гейдар Алиев, Нагорный Карабах, национализация

---

* Доктор философии по философии, доцент,
Институт Философии и Социологии НАНА, ведущий научный сотрудник отдела "Исламской философии"; Баку, Азербайджан
E-mail: hradif@mail.ru
https://orcid.org/0000-0003-0046-1440

**Цитировать статью:** Мустафаев, Р. [2023]. Отношение к Гейдару Алиеву в трафейной литературе второй карабахской войны. *Журнал «Metafizika», 6*(1), с.33-43.

***История статьи:***
*Статья поступила в редакцию: 17.12.2022*
*Отправлена на доработку: 06.01.2023*
*Принята для печати: 06.03.2023*

# Attitude towards Heydar Aliyev in the spoils literature of the second Karabakh war

**Radif Mustafayev**[*]

**Abstract.** The article examines the modern history of Azerbaijan with reference to the spoils literature of the second Karabakh war, and presents ideas about the discovery and dissemination of truths. This study focuses on the activities of the great leader, national leader Heydar Aliyev both in the Soviet period and in the period of independence, highlights the main points highlighted in the wars spoils, and also exposes the erroneous and biased conclusions of enemy propaganda.

**Keywords*:*** Republica of Azerbaijan, II Karabakh- Patriotic War, Heydar Aliyev, Naqorny Karabakh, nationalizm

## REFERENCES

**1.** Ter-Sarkisyants, A. E. (2015). Armenians of Nagorno-Karabakh: History. Culture. Studies. Institute of Political and Social Studies of the Black Sea-Caspian Region. M.: NP Publishing House "Russian Panorama", 918 pages + 40 color illustrations, maps

**2.** Alizadeh, A. (2021). *Gas conflicts" in the South Caucasus (1962-1967). Sociology of life (from the perspective of history and modernity)* collection, pp. 63-73.

**3.** Kulizadeh, Z. (2009). *Conceptual problems of research of sociocultural development (end of XX-beginning of XXI century)* (Vol.I). Baku: Teknur, 396 p.

**4.** Mustafayev, R. (2021). View of Azerbaijan in the spoils of the Second Karabakh-Homeland War. *Territorial-border problems in the South Caucasus: According to the agreement of Kars to Shusha*, September 23, Baku, Republican Scientific Conference, theses, pp. 55-56.

[*] Doctor of Philosophy, associate professor,
Institute of Philosophy and Sociology of ANAS, Leading Researcher of the Department of “Islamic Philosophy”; Baku, Azerbaijan
E-mail: hradif@mail.ru
https://orcid.org/0000-0003-0046-1440

**To cite this article:** Mustafayev, R. [2023]. Attitude towards Heydar Aliyev in the spoils literature of the second Karabakh war. *“Metafizika” journal, 6*(1), pp.33-43.

***Article history:***
*Received: 17.12.2022*
*Accepted: 06.03.2023*